UOT: 339.5

# AQRAR SAHƏDƏ İDXALIN DÖVLƏT TƏNZİMLƏNMƏSİ

**R.C.ABBASOV**
**AKTN Kənd Təsərrüfatının İqtisadiyyatı Elmi Tədqiqat İnstitutu**

*Qeyri-neft sektorunun, xüsusilə aqrar sahənin inkişafı ölkəmizin iqitisadi inkişaf prioritetlərindədir. Məqalədə, getdikcə qloballaşan dünya iqtisadi reallığında ərzaq təhlükəsizliyi məsələlərində vacib rol oynayan aqrar sahənin inkişafı,bu sahədə idxalın tənzimlənməsinin təkmilləşdirilməsi məsələləri araşdırılmış,müvafiq təkliflər irəli sürülmüşdür.*

***Açar sözlər:*** *İdxal,xarici ticarət,dövlət tənzimlənməsi,aqrar sahə,xammal, emal.*

Aqrar sahədə idxalın dövlət tənzimlənməsi problemləri, aqrar sahənin müxtəlif fəaliyyət istiqamətlərində idxala təsirin müəyyənləşdirilməsi və adekvat tədbirlərin görülməsi müasir dövrdə aktual problemlər kimi qarşıda dayanmışdır. Aqrar sahənin qlobal iqtisadi təhdidlərə və aktual problemlərə immuniteti güclü olan yeni mexanizmlərin işlənilməsi və tətbiqi vacib şərtlər kimi diqqət çəkir. Dünyanın inkişaf etmiş ölkələrində belə ərzaq problemlərinin uzunmüddətli dövr üçün balanslaşdırılması və həlli yollarının müəyyənləşdirilməsi, ölkə əhalisinin təbii artımına, sosial-iqtisadi prioritetlərinə uyğun şəkildə ərzaq əlçatanlığının təmin eilməsi məsələlərində aqrar sahənin və xüsusi ilə aqrar emal sənayesinin inkişafının modelləşdirilməsi vəzifəsini həll etmək istiqamətində davamlı işlər aparılır. Qeyd edək ki, müasir dövrdə dövlətimiz tərəfindən xarici ticarət dövriyyəsinin strukturunun təkmilləşdirilməsi, xarici ticarət fəaliyyətinin səmərəliliyini artırılması, xüsusilə ixrac potensialının- qeyri-neft ixracı potensialının gücləndirilməsi məqsədilə əhəmiyyətli təsirə malik tənzimləmə mexanizmləri həyata keçirilmişdir. Bunların içərisində, fikrimizcə, qeyri-neft məhsullarının ixracının stimullaşdırılması və bununla məşğul olan ixracatçılara kifayət qədər cəlbedici olan stimullaşdırıcı mexanizmlərlə dəstək verilməsi siyasəti daha fəal şəkildə idxalın tənzimlənməsi üçün də tətbiq olunmalıdır. Məsələn, ölkəmizdə istehsalı mümkün və bununla əlaqədar əhəmiyyətli potensialı olan fəaliyyət sahələri üzrə idxaləvəzedici istiqamətlərin təşkilinin stimullaşdırılması mexanizmlərinin təsir dairəsi və dərəcəsi yüksək olmaqla hazırlanmalı və tətbiq edilməlidir. Ümumilikdə, ölkəmizin aqrar sahədə idxalın dövlət tənzimlənməsi problemlərinin daha optimal baxılması, həlli yollarının tapılması, aqrar sahədə idxalın strukturunun təkmilləşdirilməsi, yerli istehsalın stimullaşdırılması və aqrar emal sahəsinin inkişafına idxalın təsirinin artırılması, ümumilikdə aqrar emal sənayesinin xammalla təminatında idxalın dövlət tənzimlənməsinin əsas istiqamətlərini Şəkil 3.1-də verilmiş təxmini sxemdəki kimi məqsədəuyğun saymışıq.

Beləliklə, ümumi yanaşdıqda ölkəmizdə aqrar emal sənayesinin xammalla təminatında dövlət tənzimlənməsi problemləri və bununla bağlı strateji yanaşmaların həyata keçirilməsinin vacibliyi obyektiv zərurətdən yarandığı qənaətindəyik. Çünkü, aqrar sahənin inkişafının modelləşdirilməsi, bu sahəyə dövlət dəstəyi mexanizmlərini digər iqtisadiyyat sahələri ilə nisbətdə əhəmiyyətli səviyyədə mövcud olması belə deməyə əsas verir ki, aqrar sahənin inkişafı ölkəmiz üçün kifayət qədər prioritetdir, strateji əhəmiyyət daşıyır və xüsusilə ərzaq təhlükəsizliyinin təmin edilməsi baxımından mühüm əhəmiyyət kəsb edir. Ölkəmizdə aqrar sahənin elmi əsaslar və yüksək texnologiyalar hesabına inkişaf etdirilməsi məqsədilə, yaxın perspektivdə milli iqtisadiyyatımızın inkişaf xüsusiyyətlərinə adekvat olan aqrar sahələrdə yeni innovativ məhsulların işlənməsi, hazırlanması və alınması təmin edilməlidir. Bundan əlavə, aqrar emal sənayesinin inkişafının intensivləşdirilməsi üçün strateji yanaşmaların optimallığına xüsusi önəm verilməlidir. Bunlarla bərabər, ölkə əhalisinin mühüm ərzaq və qida məhsullarına olan tələbatının ödənilməsi problemlərinə konseptual yanaşmaların qlobal iqtisadi təhlükələrə adekvat olaraq tənzimlənməsi təmin olunmalıdır. Nəhayət, aqrar sahənin və onun emal sənayesinin inkişafının idxala təsiri obyektiv qiymətləndirilməli, mühüm aqrar məhsullar üzrə idxala tələbat qiymətləndirilməli, idxaləvəzedici sahələrin və xüsusilə aqrar emal sənayesinin idxala təsiri nəzərə alınmaqla, bu sahələrin inkişafının intensivləşdirilməsi, fəaliyyətlərinin genişləndirilməsi, yerli aqrar məhsulların istehsalının təşviqi üçün idxalın dövlət tənzimlənməsi tədbirləri görülməli, vergi və gömrük rejimləri idxala obyektiv tələbat kontekstində təkmilləşdirilməli və tənzimlənməlidir. Bütün

bunlar, ölkəmizdə aqrar sahənin inkişafının modelləşdirilməsinə müsbət təsir göstərməklə yanaşı, istehlak bazarının daha da fəallaşmasına, ərzaq malları üzrə bolluğun olmasına, ərzaq əlçatanlığının səviyyəsinin yüksəldilməsinə, ölkə əhalisinin maddi rifahının və həyat şəraitinin yaxşılaşdırılmasına, mühüm ərzaq və qida məhsulları ilə təminatın qlobal iqtisadi təhlükələr (təsirlər və tendensiyalar) kontekstində gücləndirilməsinə, idxaləvəzedici fəaliyyət istiqamətlərinin genişləndirilməsi hesabına sosial-iqtisadi problemlərin həllinə yeni imkanlar və potensial formalaşdırmaq mümkün olacaqdır.




***Aqrar emal sənayesinin xammalla təminatında idxalın dövlət tənzimlənməsinin əsas istiqamətlərinin blok-sxemi, müəllif tərəfindən hazırlanmışdır.***

Ölkəmizdə xarici ticarət fəaliyyətinin, xüsusilə idxalın təkmilləşdirilməsi məsələsi hər zaman diqqət mərkəzindədir. Dünyanın İnkişaf etmiş ölkələrinin belə iqtisadi siyasətində diqqət mərkəzində olan ərzaq təhlükəsizliyi məsələlərində aqrar və kənd təsərrüfatı məhsullarının idxalının tənzimlənməsi çox mühümdür.

Respublikamızda bununla bağlı çox mühüm qərarlar verilmiş proqramlar hazırlanaraq həyata keçirilmişdir. Bununla yanaşı qloballaşan dünya iqtisadi reallığında kənd təsərrüfatı məhsullarının idxal edilən məhsullar qarşısında rəqabət qabiliyyətliliyinin yüksəldilməsi istiqamətində bir çox tədbirlərin görülməsi zəruridir. Bu sahədə aşağıdakı məsələlərin nəzərə alınaraq həyata keçirilməsini təklif edirik:

1. Kənd təsərrüfatı məhsullarının emalı və ya ailə-kəndli təsərrüfatlarında kiçik sahibkarlığın təşviq edilməsi məqsədilə məhsulun xammal şəklindən hazır məhsul şəklinə salınması üçün kəndli təsərrüfatlarının istehsal avadanlıqları ilə təmin edilməsi səviyyəsinin yüksəldilməsi.

2. İdxal rüsumlarının artırılması daxili bazarlarda qiymətlərin kəskin artması ilə nəticələnə bilər. Bütün bunlar nəzərə alınmaqla kənd təsərrüfatı məhsullarının müqayisəli üstünlüklər nəzəriyyəsinə əsaslanaraq təşviq edilməsi, idxal edilməsi iqtisadi cəhətdən daha sərfəli olan məhsullar qarşısında yerli məhsulların dayanıqlığının təmin edilməsi.

3. Ailə-kəndli təsərrüfatlarında kənd təsərüfatı məhsullarının emalının və bu sahədə istehsalla məşğul olan ailə kəndli təsərrüfatlarının müəyyən müddətə vergilərdən azad edilməsi və ya vergi güzəştlərinin tətbiq edilməsi.

4. Kənd təsərrüfatı məhsullarının daha çox hazır məhsul şəklində ixracının təşviq edilməsi mexanizmlərinin işlənib hazırlanması.

5. Kənd təsərrüfatı məhsullarının ixracının mövsümi olaraq artdığı zaman daxili bazarlarda məhsulların keyfiyyətinin yoxlanılması və əhalinin sosial rifahı baxımından süni qiymət artımının qarşısının alınması.

Hesab edirik ki, qeyd edilənlərin nəzərə alınaraq həyata keçirilməsi ölkəmizin iqtisadi inkişaf prioritetlərindən aqrar sahənin inkişafına,bu sahədə idxalın tənzimlənməsi və idxaləvəzləyici sahələrin inkişafına habelə aqrar sahədə ixracın stimullaşdırılmasına əlverişli şərait yaradan amillərdəndir.

**Государственное регулирование импорта в аграрном секторе**

**Р.ДЖ.Аббасов.**

В развитии ненефтяного сектора, одним из приоритетов развития нашей страны, является аграрный сектор.

В статье рассматривается развитие аграрного сектора, играющего важную роль в вопросах продовольственной безопасности в условиях глобализации глобальной экономической реальности, совершенствование регулирования импорта в этой области и внесены соответствующие предложения.

***Ключевые слова:*** *Импорт, внешняя торговля, государственное регулирование, аграрная промышленность, сырье, обработка.*

**State regulation of imports in the agrarian sector**

**R.C.Abbasov**

In the development of the non-oil sector, one of the priorities of our country's development is the agrarian sector.

The article deals with the development of the agrarian sector, which plays an important role in the issues of food security in the context of the globalization of the global economic reality, improving regulation of imports in this area and making relevant proposals.

***Key words:*** *Import, foreign trade, state regulation, agrarian, raw materials, processing.*

**ra545@inbox.ru**